# ƏMANƏT

Hər şeyi bilən və hikmət sahibi ALLAH`a həmd olsun. O, hökmrandır, nöqsanlardan uzaqdır, sakit həyata qovuşduran, nəzarət edib qoruyan və üstün, istədiyini etdirən, böyüklükdə misli olmayandır. ALLAH Q, müşriklərin şərik qoşduqları şeylərdən uzaqdır. Məxluqatı Ona ibadət etmələri üçün yaratmış və itaət etmələrini onlara fərz qılmışdır. O, etdiklərindən sorğu-suala çəkilməz, əksinə insanlar etdiklərindən sorğu-sual olunur. Verdiyi nemətlər səbəbi ilə Ona həmd edir və şükr edirəm. Bütün xeyirlərə görə Onu tərif edirəm. Şəhadət edirəm ki, ALLAH`dan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. O, Təkdir və şəriki yoxdur. Şəhadət edirəm ki, Muhəmməd Onun qulu və Rəsuludur. Onu seçmiş və üstün qılmış, Ona açıq nur nazil etmiş və Onu doğru yola yönəltmişdir. Ey ALLAH`ım!.. Qulun və

Rəsulun Muhəmmədə, ailəsinə və bütün əshabına xeyir-dua et, onları mübarək qıl!..

ALLAH Q belə buyurur:

***“Biz əmanəti*** (*ALLAH`a itaət və ibadəti, şəri hökmləri yerinə yetirməyi*) ***göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən*** (*götürüb özləri ilə daşımaqdan*) ***qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən, o çox zalım, çox cahildir.*** (*İnsan bu ağır əmanəti götürməklə özünə zülm etdi və cahilliyi üzündən onun çətinliyini, ağır nəticəsini bilmədi*)***. ALLAH münafiq kişiləri və qadınları, müşrik kişiləri və qadınları əzaba uğratsın, mömin kişilərin və qadınların da tövbələrini qəbul buyursun deyə*** (*əmanəti öz razılığı ilə Adəm övladına tapşırdı*)***. ALLAH*** (*möminləri*) ***bağışlayandır, rəhm edəndir!”***[1]

Bu kainata, onun səmasına, yerinə və dağlarına ağır yük, böyük vəzifə və təhlükəli

1 əl-Əhzab surəsi, 33/72-73.

iş təklif olundu, lakin o bunu daşımaqdan çəkindi. ALLAH`ın Q əzabından qorxaraq onu yerinə yetirməyi rədd etdi. Bu əmanət Adəmə A təklif olundu və Adəm A onun məsuliyyətini öz üzərinə götürdü.

***"Həqiqətən, o çox zalım, çox cahildir."*** Yəni etinasız yanaşaraq əmanəti itirən insan çox zalım, çox cahildir. Bu Adəm deyil.

Abdullah ibn Abbas N belə deyir: "Əmanət, fərzlərdir. ALLAH Q onları göylərə, yerə və dağlara təklif etdi. Yerinə yetirdiyi təqdirdə onlara mükafat verəcəkdi. Əks təqdirdə isə onlara əzab verəcəkdi. Onlar bunu xoşlamadı. ALLAH`a Q üsyan etməyərək, əksinə ALLAH`ın Q dinini ucaldaraq bu əmanətin məsuliyyətindən qorxdular."

Həsən əl-Basri Σ belə deyir:

"ALLAH onu ulduzlarla bəzədiyi yeddi qat göyə və böyük yeri daşıyan mələklərə təklif etdi. Onlara deyildi ki: "Əmanəti və içindəkini daşıyarsınız?" dedilər ki: "İçindəki nə-

dir?” Deyildi: “Əgər yaxşılıq etsəniz mükafatlandırılacaq, pislik etsəniz cəzalandırılacaqsınız.” dedilər ki: “Xeyr!” Sonra onu döşək kimi yayılan və dağlarla möhkəmləndirilən yeddi qat yerə təklif etdi. Onlara deyildi: “Əmanəti və içindəkini daşıyarsınız?” dedilər ki: ”İçindəki nədir?” Deyildi ki: “Əgər yaxşılıq etsəniz mükafatlandırılacaq, pislik etsəniz cəzalandırılacaqsınız.” dedilər ki: “Xeyr!” Sonra onu dağlara təklif etdi. Onlar da bu əmanəti rədd etdi.

Ey ALLAH`ın qulları!.. Əmanət, şəri məsuliyyətlərdir. ALLAH`ın Q haqları və qulların haqlarıdır. Kim onları yerinə yetirsə, ona savab vardır. Kim də onları pozub yerinə yetirməsə, ona cəza vardır. Abdullah ibn Məsuddan K belə dediyi rəvayət edilir:

“Namaz əmanətdir, dəstamaz əmanətdir, ölçü əmanətdir, çəki əmanətdir.” Başqa bir çox şeyləri də saydıqdan sonra:

“Bunların ən ağırı əmanət olaraq qoyulan əşyalardır” deyir.[2]

Əbu`d-Dərda Σ  belə deyir:

“Cənabətdən yuyunmaq əmanətdir.” Kimin əmanəti (güvənliyi) qüsursuz olsa, dinini möhkəmləndirmişdir. Kim əmanətə (güvənliyə) diqqətsiz yanaşsa, dini bir kənara atmışdır.  Abdullah ibn Ömər N Rəsulullahın – belə buyurduğunu rəvayət edir:

*“Əmanəti (güvənliyi) olmayanın imanı yoxdur.”*[3]

Malik ibn Ənəs K Rəsulullahın –  belə buyurduğunu rəvayət edir:

*“Əmanəti olmayanın imanı, sədaqəti olmayanın da dini yoxdur.”*[4]

2 Əhməd ibn Hənbəl. əl-Beyhəqi. İbn Əbi Hatim.

3 ət-Tabərani.

4 Əhməd ibn Hənbəl. əl-Bəzzar. ət-Tabərani.

Bu səbəbdən əmanət (güvən) peyğəmbərlərin və ALLAH`a Q yaxın qulların xüsusiyyətidir. ALLAH Q, Nuh, Hud və digər peyğəmbərlərdən E bəhs edərək belə dediklərini bildirir:

***"Şübhəsiz ki, mən sizin üçün etibar olunası (bel bağlanılası) bir peyğəmbərəm! ALLAH`dan qorxun və mənə itaət edin!"***[5]

Güvənmə azaldıqca imanın şöbələri də azalır. Huzeyfədən K bu rəvayət edilir:

"Rəsulullah  əmanətin, insanların qəlbinə endiyini (yaradılışlarına fitri meyllər kimi verildiyini), sonra Quranın verildiyini, beləliklə onu Quran və sünnədən də öyrəndiklərini bildirdi. Sonra bizə əmanətin necə aradan qalxdığını xəbər verdi. Belə buyurdu:

*"İnsan yuxudakı kimi bilmədən qəlbindən əmanət alınır. Ondan sonra ayaq izi kimi iz qalır.*

5 əş-Şuara surəsi, 26/125-126.

*İkinci dəfə də yuxudakı kimi insan bilmədən qəlbindəki əmanət hissindən bir qədər də alınır. Bundan da, qəlbdə bir iz qalır. Belə ki, ayağın üzərinə yanar köz parçası buraxsan, keçdiyi yerləri qabarmış görəcəksən. Lakin içində faydalı heç nə yoxdur."*

Sonra Rəsulullah – xırda bir çay daşı götürüb onu ayağının üzərində yuvarladı və belə davam etdi:

*"Alış-verişə gedən insanlarda əmanət tamamilə aradan qalxır. Hətta: "Filan qəbilədə dürüst bir insan var imiş" deyə barmaqla göstərilir. Hətta, qəlbində zərrə qədər iman olmayan birisinin "Nə kübar, nə ağıllı insan" deyə tərifləndiyi də olur."*[6]

Əgər insan etinasızlıqla dinin fərzlərində və vaciblərində məsuliyyətini bilə-bilə yerinə yetirməsə, qulların haqları ilə bağlı xainlik etsə, qəlbindən əmanətin alınması ilə cəzalandırılacaq. ALLAH Q, qulun bir qüsuru olma-

6 Muslim.

dan, dini vəzifələrini və qulların haqlarını laqeyd yanaşmadan bir kimsənin qəlbindən əmanəti almaqdan uzaqdır. ALLAH Q belə buyurur:

“(*Ya Rəsulum!*) ***Xatırla ki, bir zaman Musa öz qövmünə demişdi: “Ey qövmüm! Mənim ALLAH`ın sizə göndərilmiş peyğəmbəri olduğumu bildiyiniz halda, niyə məni incidirsiniz?” Onlar*** (*haqdan*) ***üz döndərdi. ALLAH*** (*Özünə asi olan*) ***fasiqləri doğru yola yönəltməz!”***[7]

Hədisin sonu əmanətin iman olduğuna işarədir. Tövhid, namaz, zəkat, oruc, həcc və qohumluq bağları, yaxşılığı əmr etmək, pis olanlardan çəkindirmək, mal, onu günah yolunda istifadə etmə əmanətdir. Göz əmanətdir, onunla ALLAH`ın Q haram qıldığı şeylərə baxma! Əl və cinsiyyət üzvü, mədə, sənə halal

---

7 əs-Saf surəsi, 61/5.

olmayan şeyləri yemək, uşaqlar sənin yanında əmanətdir, onların doğru tərbiyəsinə diqqətlə yanaş! Ərlərin qadınlar üzərindəki haqları əmanətdir. Qulların maddi və mənəvi haqları əmanətdir, onlara diqqət et!

ALLAH Q, əmanətlərin və haqların yerinə yetirilməsinə savabların ən böyüyünü vəd etmişdir. ALLAH Q belə buyurur:

***"O möminlər ki, əmanətlərini və əhdlərini qoruyub saxlayarlar (****onlara tapşırılmış əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər****) Namazlarına riayət edərlər (****həmişə vaxtlı-vaxtında namaz qılarlar****) Onlardır (****bilin****) varis olanlar - Firdovs cənnətinə varis olanlar, orada əbədi qalanlar!"***[8]

Əbu Hureyrə Λ, Rəsulullahın – belə buyurduğunu rəvayət edir:

---

8 əl-Muminun surəsi, 23/8-11.

*"Məni altı şeydən əmin edin, mən də sizi cənnətə girəcəyinizdən əmin edim." dedim ki:*

"Ey ALLAH`ın Rəsulu! Onlar nələrdir?" Belə buyurdu:

*"Namaz, zəkat, əmanət, cinsiyyət üzvü, mədə və dil."*[9]

Əmanətlərdə diqqətsiz olmaq və dində vacib olanları yerinə yetirməmək insanların hallarında qüsur və pislik yaradır, həyatı, mənasız və acı edir, cəmiyyətin əsaslarını çökdürür, ümumi və xüsusi mənfəətləri təhlükə altında qoyur, anlayışları və nizamları pozur, Kainatın sonunu elan edir. Rəsulullahdan –, Qiyamətin nə zaman qopacağı soruşulduğu zaman belə buyurur:

*"Əmanət itirildiyi zaman Qiyaməti gözləyin."*

---

9 ət-Tabərani. əl-Munziri isnadında zəiflik olmadığını deyir.

Ey ALLAH`ın qulları!.. ALLAH`dan layiqincə qorxun! Əmanətləri və vacibləri qoruyun! Haramlardan çəkinin! ALLAH Q belə buyurur:

***"O kəslər ki, əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər. O kəslər ki, düzgün şəhadət verərlər və o kəslər ki, namazlarını** (layiqincə) **hifz edərlər- Məhz onlar cənnətlərdə ehtiram olunacaq** (əzizlənəcək) **kimsələrdir!"***[10]

ALLAH Q məni və sizləri müqəddəs Quranla şərəfləndirsin...

Cəlal, ikram və izzət sahibi ALLAH`a həmd olsun. RƏBB`imə həmd edir və böyük nemətlərinə görə Ona şükr edirəm. Şəhadət edirəm ki, ALLAH`dan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. O, Təkdir və şəriki yoxdur. Şəhadət edirəm ki, Peyğəmbə-

10 əl-Məaric surəsi, 70/32-35.

rimiz Muhəmməd Onun qulu və Rəsuludur. Aləmlərə rəhmət olaraq göndərilmişdir. Ey ALLAH`ım!.. Qulun və Rəsulun Muhəmmədə, ailəsinə və bütün əshabına xeyir-dua et, onları mübarək qıl!..

Bundan sonra.. ALLAH`dan layiqincə qorxun, əmr etdiyini yerinə yetirərək, qadağan etdiyindən çəkindirərək Ona itaət edin ki, Onun cənnətini və rizasını qazanasınız!

ALLAH Q belə buyurur:

***"ALLAH sizə əmanətləri öz sahiblərinə qaytarmanızı və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etmənizi əmr edir. Həqiqətən, ALLAH`ın bununla*** (*belə bir tapşırıqla*) ***sizə verdiyi öyüd necə də gözəldir! Əlbəttə, ALLAH*** (*hər şeyi*) ***eşidəndir, görəndir!"***[11]

Bu mübarək ayə bütün əmanətləri əhatə edir. Əmanətlərin ən böyüklərindən biri də vəzifələr, məqamlar və bunların haqlarıdır.

11 ən-Nisa surəsi, 4/58.

Kim bu vəzifələrdə ALLAH`ın Q haqlarını yerinə yetirib, məsuliyyətinə verilən müsəlmanların mənfəətlərini həyata keçirsə, özü üçün doğru olanı edib, axirəti üçün xeyirli iş görmüşdür. Vəzifələrində və haqlarında qüsurlu davranan, məsuliyyətinə verilən qulların mənfəətlərini həyata keçirməyən, vəzifəsindən sui-istifadə edərək rüşvət alan və ya müsəlmanların mallarını oğurlayan özünü aldatmış, özünə xəyanət və zülm etmişdir. Rəsulullahın – belə buyurduğu rəvayət edilir:

*"ALLAH Qiyamət günü əvvəlkiləri və sonrakıları bir yerə topladığında hər xəyanət edən üçün bir bayraq qaldırılacaq və "Bu, filankəsin oğlu filanın xəyanətidir" deyiləcək."*[12]

Əmanətlərin ən böyüklərindən biri də insanların sizə əmanət olaraq verdikləri əşyalar və haqlardır.

---

12 Muslim.

Abdullah ibn Məsudun K belə dediyi rəvayət edilir:

"ALLAH yolunda döyüşmək, əmanət xaricində bütün günahlara kəffarədir." Sonra belə deyir: "Qiyamət günü qul gətiriləcək və ona "əmanətini ver!" deyiləcək. "Ey RƏBB`im! Dünya keçib getdikdən sonra necə verim?" deyəcək. Bundan sonra "Onu cəhənnəmə atın" deyiləcək və cəhənnəmə doğru aparılacaq. Əmanət, ona verildiyi kimi görünəcək. Onu görüb, tanıyacaq. Tutmaq üçün arxasınca atılacaq. Onu çiyinləri üzərində daşıyacaq. Çıxacağını zənn etdikdə çiynindən düşəcək. Beləliklə o, əbədi olaraq onun arxasınca aşağı enəcək."[13]

Ey ALLAH`ın qulları!.. ALLAH Q sizlərə seçdiyi və üstün qıldığı Peyğəmbərinə xeyir-dua etməyinizi əmr edərək belə buyurur:

---

13 Əhməd ibn Hənbəl. əl-Beyhəqi.

***"Həqiqətən, ALLAH və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər*** (*xeyir-dua verirlər*)***. Ey iman gətirənlər! Siz də ona salavat göndərib*** (*onun üçün salavat deyib*) ***layiqincə salamlayın!"***[14]

***Əli ibn Abdu`r-RAHMAN əl-Huzeyfi***
***05-08-1423 Hicri – 11-10-2002 Miladi***

---

14 əl-Əhzab surəsi, 33/56.